agreement in certain circumstances of international commercial turnover. With the appropriate knowledge of the classification of the arbitration agreement, in practice the parties to the contract can act more flexibly in order to resolve commercial disputes as much effectively as it is possible. Regarding the form of arbitration agreement, many countries are currently using the literal version of article 7 of the Model law, including the Republic of Azerbaijan. According to the German Arbitration Act of 1998, an oral arbitration agreement is not recognized as valid. In judicial practice and in doctrine, the written form of an arbitration agreement is considered as a kind of guarantee established by the national legislation and ensuring the right of the parties to judicial protection, as well as the right to protection of their interests in arbitration. However, as we have seen above, in some legal institutions this statement does not exclude the conclusion of an arbitration agreement in any form thatthe parties may prefer.

## References

1. Komarov, V., Pogoretski, V. (2009). Mezhdunarodniy kommercheskiy arbitrazh, Xarkov, «Pravo».
2. Kalinina, Y. (2017). Magisterskay adissertasiya na temu «Pravovaya priroda arbitrazh nova soglasheniya», Vladimirskiy gosudarstvenniy universitet imeni Aleksandra Grigoryevichai Nikolaya Grigoryevicha Stoletovikh.
3. Kotelnikov, Q. (2008). Dissertasiyana soiskaniye uchonoy stepeni kandidata yuridicheskikh nauk na temu «Pravovaya priroda arbitrazh nova soglasheniya i poskledstviya yevo zaklyucheniya», «Uralskaya gosudarstvennaya yuridicheskaya akademiya», Yekaterinburg.
4. Abesadze, S., Andreyeva, T., Anurovidr, V. (2018). Mezhdunarodniy kommercheskiy arbitrazh: uchebnik (izdaniye vtoroye, pererabotannoye i dopolnennoye.; pod nauchnoy redaktziyey d. y.n. Skvortzova, O., Savranskova, M. k.y.n. Sevastyanova, G.; otvetstvenniy redaktor. Lunayeva, T). "Statut".
5. Federal Arbitration Act (USA). (1947). codified july 30.
6. Ageyev, S., Inozentzev, M. (2016). Osobennosti pravovo varegulirovaniya arbitrazha v Rossii I USA, moskovskiy zhurnal mezhdunarodno vaprava. (3): p.104-117.
7. Getman, I. (2017). Mezhdunarodnoye chastnoye pravo, Moskva-Yurayt.
8. Kaldibayev, A., Linnik, A. Alternativniye arbitrazhniye ogovorki, https://online.zakon.kz/document/?doc_id=35379966&pos=6;-108#pos=6;-108.
9. Houtte, V. (2000). Consent to Arbitration Through Agreement to Painted Contracts: The Continental Experience Arbitration International. Vol.16, No.l.
10. Petrova, Q. (2017). Mejdunarodnoye chastnoye pravo, Moskva-Yurayt.
11. Minakov, A. (1985). Arbitrazhniye soglasheniya praktikara ssmotreniya v neshne ekonomicheskikh sporov, Yuridicheskaya literatura-Moskva.
12. Dmitriyeva, G. (2017). Mezhdunarodnoye chastnoyepravo, Prospekt-Moskva.

Received: 30.03.2022 Accepted: 08.05.2022

DOI: https://doi.org/10.36719/2706-6185/11/43-48

**Vəsilə Aqil qızı Məmmədova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
vesilememmedova9085@gmail.com

# CƏBRAYIL, QUBADLI VƏ ZƏNGİLANIN MEMARLIQ ABİDƏLƏRİNİN BƏRPA TƏKLİFLƏRİ

**Xülasə**

Qarabağın tarixi abidələrinin ermənilər tərəfindən dağıdılması mədəni və mənəvi tariximizə qarşı təcavüzdür. İşğal zamanı Qarabağın zəngin tarix-memarlıq abidələri yandırılmış, dağıdılmış, talan edilmiş və ya baxımsızlıq ucbatından yararsız hala salınmışdır. Bu abidələrə Cəbrayıl, Qubadlı və Zəngilan rayonlarında yerləşən bir sıra məscidlər, ziyarətgahlar, türbələr və digər tarixi-dini tikililər daxildir. Qarabağın erməni işğalçılarından azad edilməsi bizə imkan verir ki, bu ərazilərdəki tarixi-memarlıq abidələrinin hazırkı vəziyyətini araşdıraq, onların bərpası üçün tədbirlər görsün. Qarabağın tarixi memarlığının, tarixi obyektlərinin bərpası ilə bağlı işə başladıqda, ilk növbədə, onunməqsədini və istifadəsini aydın şəkildə başa düşmək və tarixən necə olduğunu araşdırmaq lazımdır.

***Açar sözlər:*** *Qarabağ, Cəbrayıl, Qubadlı, Zəngilan, tarixi abidələr*

**Vasila Agil Mammadova**
Azerbaijan State University of Culture and Arts
master student
vesilememmedova9085@gmail.com

## Proposals for the restoration of architectural monuments of Jabrayil, Gubadli and Zangilan

**Abstract**

The destruction of Garabagh's historical monuments by armenians is an aggression against our cultural and spiritual history. During the occupation, the rich historical and architectural monuments of Garabagh were burned, destroyed, looted or rendered useless due to neglect. These monuments include a number of mosques, shrines, tombs and other historical and religious buildings located in the Jabrayil, Gubadli and Zangilan districts. The liberation of Garabagh from armenian agressors allows us to investigate the current state of historical and architectural monuments in these areas and take measures to restore them. When starting work on the restoration of the historical architecture and historical objects of Karabakh, first of all, it is necessary to clearly understand its purpose and use, and to study how it was historically.

***Keywords:*** *Garabagh, Jabrayil, Gubadli, Zangilan, historical monuments*

## Giriş

Azərbaycan 2020-ci ildə Zəfər yürüşü və qətiyyətli qələbəsi ilətəxminən 30 il müddətində erməniseparatçılarının qatı şəkildə vandallıq siyasəti yürütdüyü Qarabağ torpaqlarını işğaldan azad etdi. Ondansonrakı mərhələdə Qarabağ ərazisində tamamilə və ya qismən məhv edilən memarlıq, tikinti infrastrukturunun bərpa edilməsinə istiqamətlənmiş kompleks tədbirlər planı həyata keçirilməyə başlayıb. Eyni zamanda düşmən tapdağından azad olunmuş məlum ərazilərin demək olar ki, hər yerində müxtəlif perspektivli sahələrin qurulması və yenidən dirçəldilməsi üçün yeni təkliflər hazırlanır, fərqli tədbirlər planları təsdiq edilir.

Sözsüzki, işğaldan azad olunan ərazilərdə bütün Azərbaycanı çox mühümişlər gözləyir. Bu işlərə hər şeydən öncə tariximizi və tarixi abidələrimizi bərpa etməklə başlamalıyıq. Xüsusilə, çöl-tədqiqat işləri, yolların bərpası və yenidən qurulması ilə işlərə start verilməsi işin ən vacib hissəsi idi ki, bu artıq geridə qalmış prosesdir.

Bu ərazidə tarixi abidələrlə zəngin olan bütün rayonlarda tarixi-bərpa işləri aparılır. Xüsusilə,

həm Qarabağın həm də dünyanın ən qədim regionları hesab olunan Cəbrayıl, Qubadlı və Zəngilan rayonlarıtəmir-bərpa işlərinin lap başlanğıcında yenidənqurulmağa başlandı.

Ümumiyyətlə, işğaldan azad edilmiş Qarabağın bütün rayonlarının müxtəlif tarixi-memarlıq abidələrinin tədqiq edilməsi, bərpası, qədim və Orta əsrlərdə Qarabağ və onun ətraf ərazilərinin tarixinin, memarlığının öyrənilməsi, həmin elmi araşdırmaların nəticələrinin beynəlxalq aləmdə yayılması hər birvətəndaşın qarşıda duran ən mühüm vəzifələrdir. Dağlıq Qarabağ və ətraf rayonların abidələrini əhatə edəcək tədqiqatlar sistemli şəkildə bir neçə mərhələdə aparılmalıdır (Azərbaycan Respublikası ərazisində dövlət mühafizəsinə götürülmüş daşınmaz tarix və mədəniyyət abidələrinin əhəmiyyət dərəcəsinə görə bölgüsünün təstiq edilməsi haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı, 2001).

1. Bütün zərər çəkmiş abidələrin hazırkı vəziyyəti və onlara vurulan ziyanın həddi, məbləği müəyyənləşdirilməlidir.

30 ilə yaxın müddətdəki işğal tarixində işğal altında qalan abidələrimizə erməni vandallarının vurduğu ziyanlar fərqli səpkidə olub. Bu barədə hələ tam dəqiqməlumatımız olmasa da, qədim dövr arxeoloji abidələrdə ermənilərin qeyri-qanuni qazıntılar apardığı, bu işdə bəzi Avropa alimlərinin də yaxından iştirak etməsi bu ədalətsiz işğalın ən iyrənc tərəflərindən biridir.

Nəzərə alsaq, ən qədim dövr abidələrinə aid olan qədim yaşayış məskənlərinin böyük qismi Cəbrayıl və Qubadlı, Füzuli rayonlarının ərazisinə düşür, o zaman təmir-bərpa işlərinə məhz buradan başlanılması uyğun variant hesab oluna bilər.

Dağıntılara və mənimsəmələrə məruz qalmış növbəti qrup abidələr Azərbaycanın qədim dövlətlərindən olan Qafqaz Albaniyası dövrü və sonrakı Orta əsrlərə aid xristian dini təyinatlı arxeoloji-memarlıq kompleksləridir. Bu abidələrin bir çoxunun əvvəlki vəziyyəti dəyişdirilmiş, bərpa adı ilə erməniləşdirilməsi işləri aparılmışdır.

Maraqlı və təəssüfəndirici maqam budur ki, işğal tarixində ən çox dağıntılara, vandalizm hərəkətlərinə məruz qalan abidələrimiz isə İslam mədəniyyətinə aid olanabidələrdir. Bunun başlıca səbəbi isə budur ki, məhz islam mədəniyyəti abidələrini ermənilər mənimsəyə, onların da üzərinə qondarma tarixlərini yaza bilmədiklərinə görə kütləvi və xüsusi amansız şəkildə istismar olunmuşdur. Bəzziləri dağıdılmış, çox hissəsi isə təhqir olunaraq donuz tövləsi kimi istifadə ounmuşdur. Çünki həmin abidələrin üzərində ərəb əlifbası ilə yazılmış epiqrafik yazılar olub. Bunlara məscidlər, qəbirüstü məzar daşları, türbələr və s. abidələrdir.

2. Bundan sonra işğaldan yeni azad edilmiş bütün ərazilərdə tarixi abidələrin aşkar edilməsi üçün vəbərpa edilməsinəbaşlanılması üçün arxeoloji axtarış işləri aparılmalıdır.

Arxeoloji və tarixi-memarlıq abidələri aşkar edilməli, yerləşdiyi ərazinin yeri tam müəyyənləşdirilməli və onların haqqında ilkin məlumatlar toplanmalıdır.

Dağlıq Qarabağ və ona bitişik ərazilərdə hələ sovet dövründə nisbətən ətraflı arxeoloji tədqiqat işləri Tərtər, Ağdam və Füzuli rayonlarında aparılıb. Hadrut rayonunda Azıx və Tağlar mağara düşərgələrində uzun illər arxeoloji qazıntılar aparılsa da rayonun digər abidələrində geniş tədqiqat işləri həyata keçirilmə-yib. Bütün bunların səbəbi isə qazıntıların aparılması işinin qısa zaman kəsiyində baş verməsi Kəlbəcər, Laçın, Qubadlı, Zəngilan, Cəbrayıl rayonlarında işğala qədərki dövrlərdə məhdud zaman çərçivələrində aparılmış tədqiqatlar nəticəsində azsaylı abidələr aşkar edilib. Halbuki bu rayonlarda, Qarabağın dağlıq və Aran ərazilərində daha çoxsaylı tarixi abidələrin olmasını ehtimal etmək üçün hərtərəfli əsaslar vardır (2).

3. Həm əvvəllər məlum olan, həm də yeni aşkar edilmiş abidələrin pasportlaşdırılması, işləri həyata keçirilməlidir.

Bu mərhələdə fəaliyyətin əsas hissəsi 2-ci mərhələ ilə paralel həyata keçirilə bilər.Pasportlaşdırma işlərində abidələrin tipi, dövrü, saxlanma dərəcəsi, sərhədləri qeyd edilməli, digər göstəriciləri səciyyələndirilməlidir.

4. Bütün bunlarla yanaşı, elmi əhəmiyyəti, tariximizin ayrı-ayrı mərhələlərinin tədqiqi üçün aktuallığı müəyyən edilərək bir sıra abidələrdə uzun müddətli arxeoloji qazıntı işləri yenidən, həm də çox geniş miqyasda aparılmalıdır.

Ümumiyyətlə,işğaldan azad edilmiş ərazilərdə geniş, kompleks arxeoloji tədqiqat işləri aparılması planları yaxın zamanın vəzifələridir.Qarabağın dağlıq və aran ərazilərinin abidələri tarixi mahiyyət eti-barilə biri-birini tamamlayır. Buna görə də tədqiqat işləri bölgənin hər bir coğrafiyasını əhatə etməlidir.

Qarabağ memarlığının tarixi obyektlərinin bərpası layihələrinin hazırlanması bu problemi kompleks

şəkildə, yəni memarlıq və mühəndislik baxımından həll edə bilən layihə təşkilatlarında aparılmalıdır. Ərazinin memarlığının tarixi faktlar saxlanılmaqla bərpasına üç əsas bölmənin hər birinə müvafiq profilli mütəxəssis rəhbərlik etməlidir.

Qarabağın tarixi memarlığının, tarixi obyektlərinin bərpası ilə bağlı işə başladıqda, ilk növbədə, onun məqsədini və istifadəsini aydın şəkildə başa düşmək və tarixən necə olduğunu araşdırmaq lazımdır. Çünki bütün sonrakı işlərin istiqaməti bundan asılıdır.

Onu da qeyd etmək lazımdır ki, təmir-bərpa zamanı ən əsas məsələlərdən biri Qarabağa olan ərazi iddiaları nəticəsində 1988-ci ilin sonlarından başlayıb 2020-ci ilə qədər davam edən müharibə zamanı Qarabağ abidələrinə ermənilərin vurduğu ziyanı da gələcək nəsillərə göstərmək üçün mütləq şəkildə xüsusi tədbirlər görmək lazımdır. Bunun üçün də abidələrin bərpası zamanı ya çox geniş şəkildə, müxtəlif rakurslardan çəkilmiş şəkillər, videolardan toplu hazırlamaq olar. Bunu həm online, həm kitab formatında olması daha məqsədəuyğundur (Tahirqızı, 2013: 6).

Bundan başqa, təmir-bərpa işləri zamanı erməni vandalizminin izlərinin tarixi abidələrimizin üzərində saxlanılmasımütləq şəkildə həyata keçirilməlidir.

Bütün bərpa edilmiş tarixi obyektləri müxtəlif kateqoriyalara bölmək olar:

• muzey təyinatlı obyektlər və müasir istifadənin başqa bir növünə uyğunlaşdırılmış əşyalar. Muzey obyektləri də öz növbəsində aşağıdakılara bölünə bilər:

-ölkənin incəsənət və mədəniyyətinin inkişafında müəyyən dövrün abidələri olan əsərlər:

-müxtəlif üslub dövrlərində iri memarların və qurucuların əməyi nəticəsində formalaşan əsərlər:

-tarixi şəxsiyyətin həyatı və ya fəaliyyəti ilə bağlı hər şeyin qoruyub saxlaması və bərpa edilməsiilə ilk iki qrupdan fərqlənən xatirə xarakterli muzeylər.

Nəzərə alsaq ki, müharibədən öncə Cəbrayıl, Qubadlı və Zəngilan rayonlarında müxtəlif muzey növləri fəaliyyət göstərib, ona görə bu muzeylərin bərpası əsas məsələlərdən birinə çevirilməlidir. Xüsusən də, tarixşünaslıq muzeyərinin bərpası vacib məsələlərdən biridir. Sadəcə bunu qeyd etmək kifayətdir ki, I Qarabağ savaşı zamanı Cəbrayıl rayonunun xeyli zəngin tarix-diyarşünaslıq muzeyinin çox eksponatı muzeyin rəhbərliyi, işçiləri tərəfindən daşınaraq Bakıya gətirilmişdi. Deməli tezliklə, Cəbrayıl rayonunda muzeyin bərpasını təmin etmək mümkündür (Gubadli: the gates of the ancient Azerbaijani land of Zangezur, 2013: 424).

Muzey təyinatlı obyektlər qruplarının hər biri naturada araşdırmadan başlayaraq, bərpa işlərinin aparılması metodologiyasına qədər xüsusi yanaşma tələb edir. Odur ki, ərazidə muzey təyinatlı bütün obyektlərin tikintisi zamanı da binanın tərtibatı tikintisi xüsusi tələblərə və müasir standartlara uyğunlaşmalıdır.

Qarabağ ərazisində təmir-bərpa işləri zamanı vacib olan məsələlərdən biri də budur ki, regionun dağlıq əraziləri onsuz da təbii resurslarla, bitki aləmi iə zəngindir. Sadəcə müharibə dövründə və 2020-ci ildə Vətən savaşı zamanı təbiətə ciddi ziyan dəymişdir. Təbii ki, tarixən də öz unikal təbiəti ilə seçilən Kəlbəcər, Laçın, Şuşa ərazilərində təbii resursların öz-özünə bərpa olunacağı danılmaz faktdır. Amma haqqında danışdığımız Cəbrayıl, Zəngilan və Qubadlı əraziləri, xüsusən də Cəbrayıl rayonunun əsasən düzən ərazidə - Gəyən düzündə yerləşməsi burada geniş meşə zolaqlarının, yaşıllıq parkların salınmasını labüd edir (Cəlilova, 2020).

Ən yaxşı təklif isə, fikrimizcə, tarixi parkların salınmasını təmin etməkdir. Tarixi parklardan müxtəlif növ müasir istirahət üçün istifadənin mövcud təcrübəsi müvəqqəti hal kimi qəbul edilməlidir, çünki bu, şəhər sakinlərinin istirahəti problemini tam həll etmir və eyni zamanda, tarixi parkların vəziyyətinə və görünüşünə zərərli təsir göstərir.

Odur ki, yaxşı təbii şəraiti olan ərazilərdə tarixi parkların nisbətən qısa müddətdə ərazinin təbii ehtiyatlarını yaxşılaşdırmağa imkan verəcəkdir. Bəzi hallarda, tarixi parkların mühafizə zonaları aktiv istirahət formalarının yerləşdirilməsi üçün istifadə edilə bilər.

Əgər bu parkların muzey obyektinə çevrilməsi, və ya muzeyərin ətrafında parkların salınması həyata keçirilə bilən mümkün işdirsə, onda mütləq şəkildə buna ciddi yanaşmaq lazımdır. Parkların yaradılması muzey obyektinin bərpasından əvvəl və ya onunla paralel getməlidir ki, bu da kommunal xətlərin ən rasional şəkildə çəkilməsinə, dayanacaqların yerləşdirilməsinə və ziyarətçilərə xidmət sistemini təmin etməyə imkan verəcəkdir.

Bu problemə məhəl qoymamaq tarixi-memarlıq və ümumiyyətlə memarlıq abidələrinin bərpası üçün xərclənən vəsait və qüvvələrin məqsədə tam nail olmaması deməkdir. Onların kompozisiyaları müasir

strukturların yaradılmasında öz əksini tapacaq, muzeylərin və ya digər abidələrin bərpası və ya tikilməsiağacların vəziyyətinə mənfi təsir göstərir və bu, bərpa işlərini təbii şəraitdə olduğundan xeyli tez yenidən həyata keçirməyə məcbur edəcəkdir.

İşğaldan yenicə azad olunmuş torpaqlarda, xüsusən də, müharibənin ilkin mərhələsində erməni separatçılarından təmizlənmiş Cəbrayıl, Qubadlı, Zəngian ərazisində aparılan təhlillər nəticəsində planlaşdırma və ya bərpa tapşırıqlarında göstərilən nəticə bütün ərazinin və ya onun ayrı-ayrı hissələrinin bərpa olunmalı olduğu müddətlə təsdiq edilməli və dəqiqləşdirilməlidir. Bu qənaət ərazidəki ərazidəki tarixi-memarlıq bir sənət əsəri kimi sonrakı mövcudluğunu əvvəlcədən müəyyən etdiyi üçün ona xüsusi diqqət yetirilməlidir.

Müharibə dövründə ərazidə demək olar ki, vandalizmə məruz qalmamış obyekt yoxdur. Ancaq qarşıya qoyulan məqsəd tələb edir ki, ərazi ən yüksək çiçəklənmə dövrü üçün bərpa edilməlidir (Məmmədov, 2020).

Təbii ki, müharibə dövründə tarixi-memarlıq abidələrinin dağıdılması ən adi hallardır, odur ki, buna dünya praktikasında da çox hallarda rast gəlinir. Hətta bəzən elə hallar da olur ki, bir abidə, tarixi obyekt və ya obyektin hissələri mövcud olduğu müddətdə bir neçə dəfə yenidən qurulur. Bu hallarda hərtərəfli təhlil və orijinal görünüşün naturada qorunub saxlanılan ilə müqayisəsi tələb olunur. Burada ümumi tövsiyələr ola bilməz, hər şey bir çox spesifik amillərdən asılıdır.

Tarixi memarlıq abidələrində ilkin kompozisiyanı saxlamaq üçün abidənin bərpasını iki mərhələyə bölmək lazımdır: sonrakı mərhələdə o işlər aparılmalıdır.

Məsələn abidənin ətrafında və ya yuxarıda da qeyd etdiyimiz kimi, muzeyin ətrafında parkların salınması, yaşıllıqların bərpası ən unukal çıxış yoludur ki, bu, həm təbiətin gözəlləşməsinə, həm də illərdir yaşayışsız qalan, ancaq hərbi baza kimi istifadə olunan ərazilərin yenidən dirçəldilməsinə yönələn işdir.

Ancaq təbii ki, bütün bunları həyata keçirmək üçün əraziyə ilkin mərhələdə yüksək standartların tələbinə uyğun yol çəkilməsini təmin etmək lazımdır ki, bu mərhələdə artıq keçib. Yəni yol çəkilməsini artıq ötən dövr ərzində həyata keçirilməsini və ərazidə yenidən yollarını bərpasını qeyd etmək olar. Ümumiyyətlə postmüharibə dövründə abidələrin bərpasından,xidmət obyektlərinin tikilməsindən də əvvəl yolların bərpasını təmin etmək mütləq şərtdir. Bunu reallaşdırarkən isəmövcud təbii resurslara zərər vermədən (yol şəbəkəsinin düzəldilməsi) həyata keçirmək əsas şərtdir.

İkinci mərhələdə - tam bərpa, yalnız ağaclar kritik yaşa çatdıqdan sonra həyata keçirilir. Mövcud ağacların tam miqyasını əhatə edən həll yollarına son dərəcə ehtiyatla yanaşmaq lazımdır.

Qarabağda bütövlükdə bütün ərazi üçün çiçəklənmə dövrü müəyyən edildikdən sonrakı dəyişikliklərin də həyata keçirilməsi əslində ilkin mərhələdə başlanır.Ərazidəki tikiləcək məkanların, salınacaq yaşayış massivinin tərkibini həm ümumi, həm də ayrı-ayrı elementlər baxımından çiçəklənmənin tərkibi ilə müqayisə etmək lazımdır. Relyef, planlaşdırma, ağac və kolların yerləşdirilməsi, onların növ tərkibi, memarlıq strukturlarının bərpası, ictimai iaşə obyektlərinin tikintisi və s. məsələlər ilkin planlaşdırılmadan başlayaraq nəzərə alınmalıdır.

Bundan başqa, əraziyə baxış keçirərkən mühafizə zonası məsələsini də nəzərdə saxlamaq vəaydınlaşdırmaq lazımdır. Əgər bərpa olunan memarlıq-tarixi-tikinti obyektlərinin perspektivləri ətraf ərazinin infrastrukturu, landşaftı ilə üzvi şəkildə bağlıdırsa onda tarixi obyektin və onun ətrafında olan bütün infrastrukturların mühafizə zonasına daxil edilməsinə nail olmaq lazımdır (7).

Məsələn, tarixi məscidlərin, yaxud insanların kütləvi şəkildə getdiyi pirlərin ətraf ərazilərinə ictimai iaşə obyektlərinin, müxtəlif infrastrukturların salınmasının vacib şərt olması danılmazdır. Nəzərə alsaq ki, xüsusilə, Cəbrayıl rayonunda bu cür ərazilər və onlara insanların kütləvi şəkildə axınları hələ sovet hakimiyyəti dövründən mövcud olub onda ərazinin bərpası, yenidənqurması zamanı bunlar da nəzərə alınmalıdır.

Ziyarətçilərin xidmət sistemində, aktiv istirahət ərazisindən istifadə edərək ərazidəki qonaqlama yerlərindəyerləşdirilməsi üçün və gələcəkdə bu sahədə problemlərin yaranmaması üçün qeyd olunanları da təmin etmək lazımdır.

Odur ki, ərazidə qarşıda duran böyük və mühüm abadlıq layihələrinin bərpası üçün bütün layihələrdən əvvəl, adətən, texniki-iqtisadi əsaslandırmahazırlanmalıdır.

Qarabağın işğaldan azad olunmuş ərazilərində hər cür xidmət növlərinin təklifi, yaşayış massivləri, ictimai iaşə obyektlərinin tikintisi təmin edilməlidir. Bu, təbii ki, həm məcburi köçkün, həm də bütünAzərbaycan Respublikası vətəndaşlarınınhəvəslə adı çəkilən əraziyə yenidən köçməsi

üçün də zəminyaradacaqdır.

Ölçüsü böyük, vəziyyətə və ya tapşırığın tələblərinə görə mürəkkəb tarixi obyektlərin bərpası layihələrinin hazırlanması əsasən, iki mərhələdə həyata keçirilməlidir.

1. Dağıdılmış, yarımdağıdılmış tarixi memarlıq abidələrinin hərtərəfli araşdırılaraq, bütün yuxarıda danışdığımız məsələlərin təmin edilməsini nəzərə alaraq, beynəlxalq standartlara uyğun dizayn vəlayihələrin hazırlanması;

2. İşçi qüvvəsinin təmin edilməsi. Mütəxəssislərin əraziyə dəvət olunması.

Layihə, qeyd etdiyimiz kimi, kompleks şəkildə hazırlanmalıdır: Tarixi obyektin tarixiliyini saxlamaqla landşaft hissəsinin, mühəndis strukturlarının və hidravlik sistemin layihələri eyni vaxtda təsdiq üçün təqdim edilməlidir. Bundan başqa tarixi-memarlıq konstruksiyalarının və kiçik formaların onların sonrakı istifadəsi proqramı ilə bərpası üzrə işlərin ardıcıllığı, tikinti işlərinin təşkili layihəsi və onların icrasının ardıcıllığı qrafiki də hazırlanmalıdır.

Əvvəlcədən təqdim olunan layihələr ərazidə tarixi-memarlıq abidələrinin bərpası,tikintisi və sonrakı istismar zamanı yalnız xərclərin azaldılmasını deyil, həm də landşaft obyektinin normal uzunmüddətli mövcudluğunu müəyyən edir. Buna görə də əvvəlcədən müəyyən olunmuş layihələr mütləq şəkildə nəzərə alınmalıdır.

Bəzən ayrı-ayrı növlərdən olan tarixi-memarlıq nümnələrinin bərpası zamanı dünya təcrübəsini də nəzərə almaq lazımdır.Məhz bu məsələdə də, yenə yalnız bütövlükdə bütün obyekt üçün hazırlanmış və təsdiq edilmiş layihə olduqda mümkündür. O, bütün bölmələrin kompozisiya üzrə qarşılıqlı əlaqəsi məsələlərini, mühəndislik məsələlərini həll etməli, işin məqsədəuyğun ardıcıllığını işləyib hazırlamalıdır.

Hər hansı bir tarixi abidə tamamilə dağıdılıb və ərazidə abidə ilə bağlı heç bir iz qalmayıbsa, o zaman bu abidənin tarixi mənbələrdəki və ya şəkillərdəki təsvirinə uyğun bərpası mümkün ola bilər. Bu baxımdan tamamilə dağıdılmış abidələrin bərpasına iki cür yanaşma ola bilər:

- ya həmin abidənin yerində eyni struktura, quruluşa uyğun yenidən tikmək lazımdır. Bunun müsbət cəhəti ondan ibarətdir ki, gələn turistlər ərazinin yerli əhalisinə aid abidə, tikinti, memarlıq vərdişlərinin tarixinin qədimliyini dərk edirlər. Təbii ki, bunun da müəyyən əsaslandırması olmalıdır.

- və ya ərazidə vaxtilə yerləşmiş tarixi memarlıq abidəsi haqqında çox ətraflıtarixi materiallarla zəngin online və canlı resurslardan ibarət memorial abidə, muzey və s. təsis etmək olar. Təbii ki, burada da erməni vandalizmininizlərini yeri və beynəlxalq ictimaiyyətə çox ətraflı şəkildə nəzərə çarpdırmaq lazımdır.Eyni zamanda tədqiq olunan dövr, abidənin bərpasının reallaşdırıldığı dövr üçün xarakterik olan ideyaları və fərdi texnikaların tətbiqini də reallaşdırmaq vacib məslələrdən biridir.

Layihə üzərində işə başlayarkən, ilk növbədə, obyektin tarixi sərhədlərinin dəyişməz qalıb-qalmadığını müəyyən etmək lazımdır. Bunun üçün regionun inkişafı üçün perspektivli sxemdən istifadə etmək mümkündür. Bundan əlavə, bir qayda olaraq, müharibə zamanı dəyişmiş mühitə görə tarixi obyektin sərhədləri boyunca yerləşdirmələrə düzəlişlərin tələb olunub-olunmayacağını öyrənmək lazımdır.

Ərazidəki tarixi memarlıq abidələrinin sistemli bərpası zamanı əraziyə perspektivli nəqliyyat sxemi diqqətlə öyrənilməlidir. Planlaşdırılan nəqliyyat dayanacaqları tarixi abidələrə girişlərin yerləşdiyi yerə uyğun gəlmirsə, onların inkişaf etmiş dayanacaqlara uyğunlaşdırılmasına nail olmağı da planlaşdırmaq lazımdır.

Qarabağda və ümumiyyətlə, tarixi-memarlıq abidələrinin bərpa olunduğu bütün ərazilərdə yol şəbəkəsində işləyərkən bütövlükdə obyektin perspektivli inkişafı və onun memarlıq strukturlarının, ekskursiya marşrutlarının iştirakını təmin etmək vacib məsələdir. Odur ki, tarixi obyektin təyinatını bilmək, muzey, məscid, saray, xatirə evləri, heykəllərin və s. böyük və kiçik tarixi-memarlıq abidələrinə gedişi təmin edəcək və ekskursiyalarla pavilyonlara baş çəkəcək yol şəbəkəsinin müəyyən qədər yenidən qurulmasının zəruriliyini və məqbulluğunu müəyyən edir (Müharibə və tarixi-mədəniyyət abidələrimiz: işğal olunmuş Azərbaycan ərazilərində xənagahlar, pirlər, ziyarətgahlar, 2006: 63).

Tarixi memarlıq abidələri arasında bir növ var ki, müharibə zonasında onların salınması mütləq şərtərdən biridir. Bu xiyabanlardır. Azərbaycan müharibə ölkəsi olduğundan demək olar ki, regionların hər birində kifayət qədər çox Şəhidlər xiyabanı salınıb. Bilirik ki, II Qarabağ müharibəsi zamanı Cəbrayıl, Zəngilan bölgəsi uğrunda gedən döyüşlərdə çoxlu sayda Şəhid itirmişik. Odur ki, ərazinin bərpası zamanı mühüm məsələlərdən biri də qəhrəman vətən oğullarının xatirəsini əbədiləşdirməkdir. Bu, həm də tarixi abidə olmaqdan da başqa, ərazininyaşıllaşmasına da xidmət edəcəkdir. Şəhidərin hər

birinin adına bir ağacın əkilməsi ilə xiyabanın salınması, fikrimizcə, həm vacib, həm də maraqlı ideyadır. Xiyaban salınarkən ağacların əkilməsi üçün ağac növlərini seçərkən bir sıra halları nəzərə almaq lazımdır: ağacların dekorativ xüsusiyyətlərinin kompozisiya tələblərinə uyğunluğu, eni, ağac massivinin yaxınlığı, xiyaban ərazisində neçə şəhidin xatirəsinin əbədiləşdiriləcəyi yönündə də araşdırılma aparılsa, əlbəttə ki, daha yaxşı olar. Unutmaq lazım deyildir ki, bu salınan abidə həm də gələcək nəsillərə yadigar qalacaq tarixi-memarlıq abidəsi olacaqdır (Məmmədov, 2015: 96). Odur ki, abidənin tikintisi və ya bərpası zamanı, xüsusilə istifadə olunan materialın keyfiyyətinə tələbkar olmaq lazımdır.

Cəbrayıl, Qubadlı ərazisindən danışarkən ərazinin, eləcə də Azərbaycanın ən qədim insan məskəni olan Azıx mağarası haqqında danışmasaq olmaz. İşğaldan azad olunduqdan sonra ərazi haqqında araşdırılmalar aparılmış və məlum olmuşdur ki, işğal illərində ərazidə erməni separatçı qüvvələri və vandalları müxtəlif yönümlü tədqiqatlar aparmışlar. Təbii ki, bu, qanunsuz bir proses idi və cinayət işidir.

## Nəticə

Artıq bildiyimiz kimi, torpaqlarımız işğaldan azad olunub və yenidən Azıx mağarasında tədqiqatların aparılması üçün də əlverişli imkan yaranıb

Professor Nəcəf Müseyibli söyləyib ki, Vətən müharibəsindən sonra bir qrup arxeoloq artıq Azıx mağarasına gedib:

"Onlar daha sonra hərbçilərimizlə birlikdə geri qayıtdılar. Mağaradan bir sıra tədqiqat nümunələri götürülüb, hazırda bizim arxeoloji fondda saxlanılır. Yaxın günlərdə Azıx mağarasına ekspedisiya planlaşdırılmır. Çünki hələ qış aylarıdır. Ekspedisiyalar əsasən yay aylarında olur. Həm də ki, indiki vəziyyətə görə bu mümkünsüzdür. Həmin ərazilərə daxil olmaq üçün xüsusi icazələr verilməlidir. Bunlar olarsa, şübhəsiz ki, təkcə Azıx yox, bütün azad olunmuş ərazilərimizdə geniş arxeoloji işlərin aparılması nəzərdə tutulur".

Beləliklə, postmüharibə dövründə tarixi-memarlıq abidələrinə diqqət və qayğı kifayət qədər çoxaldılmalıdır. Bu, xalqın tarixinin, milli-mədəni abidələrinin bərpası ilə nəticələnməli və xalqımızın qədim mədəniyyətindən xəbər verməlidir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası ərazisində dövlət mühafizəsinə götürülmüş daşınmaz tarix və mədəniyyət abidələrinin əhəmiyyət dərəcəsinə görə bölgüsünün təstiq edilməsi haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı. (2001). Bakı şəhəri, 2 avqust. № 132.
2. İlham Əliyev Qubadlı və Zəngilan rayonlarında olub. Azərbaycan Respublikasının Prezidentinin səhifəsi. president.az/az/articles/view/49394. 23.12.2020
3. Tahirqızı, Ü. (2013).Ermənilər yüzlərlə tarixi abidələrimizi dağıdıblar."Xalq cəbhəsi" qəzeti, 15 s.
4. Gubadli: the gates of the ancient Azerbaijani land of Zangezur. (2013). Baku: Turhan IPO, 424 p.
5. Cəlilova, İ. (2020). Zəngilanda məhv edilən tarixi abidələrimiz. Tarixçi Kamran İsmayılovla müsahibə. sputnik.az/20201216/425713936.html.
6. Məmmədov, S. (2020). Ermənilərin xroniki xəstəliyi: tarixi yaddaşımızı oğurlamaq mərəzi. "Xalq" qəzeti, № 227, 6 s.
7. Müseyibli, N. https://science.gov.az/ru/news/open/15544
8. Müharibə və tarixi-mədəniyyət abidələrimiz: işğal olunmuş Azərbaycan ərazilərində xənagahlar, pirlər, ziyarətgahlar. (2006). Bakı, 63 s.
9. Məmmədov, N. (2015). İşğal altındakı tarixi-dini abidələrimiz. Bakı: Nurlar, 96 s.

Göndərildi: 21.03.2022 Qəbul edildi: 17.05.2022

DOI: https://doi.org/10.36719/2706-6185/11/49-53

**Elnurə Nəsrulla qızı Mustafayeva**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
mustafayevaelnure3@gmail.com

# ŞƏHƏR İRSİNİN MUZEYLƏŞDİRİLMƏSİ VƏ ŞUŞA TARİXİ MUZEYİ

**Xülasə**

Arxeoloji irs tarixi-mədəni irsin tərkib hissəsi olub, keçmişin maddi qalıqlarından, onların tədqiqatı nəticəsində əldə edilən nəticələrdən və biliklərdən, qorunan arxeoloji abidələrdən ibarətdir. Arxeoloji irs tarixi yaddaşın mühüm mənbəyidir. Arxeoloji obyektlərin sayı zaman keçdikcə azalır. Arxeoloji abidələrin dağıdılmasına insan və texnogen faktorlar böyük təsir göstərir.

Azərbaycan xalqının arxeologiyasının öyrənilməsində tarix və mədəniyyət abidələrinin rolu böyükdür. XIX əsrin ikinci yarısından Azərbaycanın mədəni dəyərləri Azərbaycanın tarixi abidələri və toponimləri xarici alim və səyyahların diqqətini cəlb etmişdir. Bununla yanaşı, Azərbaycan alim və tədqiqatçılarının ölkəmizin arxeoloji irsinin öyrənilməsinə, qorunub saxlanmasına, tədqiqinə və təbliğinə verdiyi töhfə böyükdür.

Tarixi informasiyanı özündə daşıyan arxeoloji abidələr zamanın sınağından çıxaraq zənginləşən, nəsildən-nəsilə bir yadigar kimi ötürülən ən qiymətli xəzinələrdən biridir. Ölkəmizdə arxeoloji abidələr, eləcə də saray komplekslərinin, tarixi memarlıq abidələrinin qorunması, bərpası, keçirdiyi əhatəli tədbirlər barədə konkret vəzifələr müəyyən edilmiş, hüquqi-normativ aktlar qəbul edilmişdir.

***Açar sözlər:*** *arxeologiya, irs, abidə, memarlıq, kompleks*

**Elnura Nasrulla Mustsafayeva**
Azerbaijan State University of Culture and Arts
master student
mustafayevaelnure3@gmail.com

## City Heritage Museum and Shusha History Museum

**Abstract**

Archaeological heritage is an integral part of historical and cultural heritage and consists of material remains of the past, the results and knowledge obtained as a result of their research, and protected archaeological monuments. Archaeological heritage is an important source of historical memory. The number of archaeological sites decreases over time. The destruction of archaeological monuments is greatly influenced by human and man-made factors.

The role of historical and cultural monuments in the study of the archaeology of the Azerbaijani people is great. Since the second half of the 19th century, Azerbaijan's cultural values, historical monuments and toponyms of Azerbaijan have attracted the attention of prominent Russian and foreign scholars and travellers. However, we must not forget the great work of Azerbaijani scientists and researchers, their contribution to the study, preservation, research and promotion of Azerbaijan's cultural heritage.

Archaeological monuments, which reflect historical memories, are one of the most valuable treasures, enriched by the test of time and passed down from generation to generation as a memento. Highly appreciating the importance of archaeological monuments, our state has given specific tasks on the protection and restoration of archaeological monuments, as well as palace complexes, historical and architectural monuments, a set of comprehensive measures, and indicated the principles of working with individual items.

***Keywords:*** *archaeology, heritage, monument, architecture, complex*

## Giriş

Dünyada elə muzeylər var ki, onların fəaliyyəti tarixi yaddaşı qorumaq, şəhərlərin yaranma və inkişaf tarixini əks etdirən materialları nümayiş etdirməkdir. Onları ziyarət edən insan şəhərin həyatının eniş-yoxuşları haqqında ətraflı məlumat alır, onun dünya şöhrətli doğmaları, burada saxlanılan mədəni irsi, adət-ənənələri haqqında məlumat alır.

Söhbət dünya şəhərlərinə həsr olunmuş muzeylərdən gedir - sakinlərin öz şəhərlərinə məhəbbət və hörmətlə münasibətinin şahidləri, hər biri özlüyündə unikal, özünəməxsus və təkrarolunmazdır. Roma, London, Paris, Praqa, Moskva, Sankt-Peterburq, Berlin, Tokio, Nyu-York, Kiyev, Tallin, Minsk kimi iri şəhərlərdə belə muzeylər var. Muzeylərin yaranma tarixini əks etdirən çoxşaxəli fəaliyyətini nəzərə alaraq böyük şəhərlərin və paytaxtların inkişafıbelə qurumların yaradılmasına tarixi ehtiyac olduğunu deyə bilərik (Alməmmədov, 2016: 47).

Dünyada insanın yayıldığı ilk məskənlərdən biri olan və əsrlər boyu təkcə Azərbaycanın deyil, bütün Zaqafqaziyanın iqtisadi, siyasi və mədəni həyatında mühüm rol oynayan Şuşanın və ətrafının olduqca zəngin bir keçmişi vardır. Qarabağın qədim tarixinin öyrənilməsi XIX əsrdən başlanmışdır. Qədim qarabağlıların çoxminillik tarixi maddi-mədəniyyət abidələrində təbəqələşmiş materiallar və yazılı mənbələr əsasında tədqiq edilib öyrənilmişdir. Şuşanın qədim dövr maddi-mədəniyyət abidələri XIX əsrin əvvəllərindən etibarən xarici səyyahların, həvəskar tədqiqatçıların diqqətini cəlb etmişdir. Onların apardığı qazıntılar Şuşanın qədim tarixinin öyrənilməsinə xidmət etməmiş, qarət xarakteri daşımışdır. Azərbaycana, eləcə də Şuşaya gəlmiş səyyahlar, həvəskar tədqiqatçılar (müxtəlif sənət sahibləri) əsasən eramızdan əvvəl IV-I minilliklərə aid tunc və dəmir dövrlərinə aid qəbirlərdə qazıntı işləri aparmışlar. Bu materiallar Şuşanın qədim tarixinin öyrənilməsində bir mənbə kimi mühüm əhəmiyyət kəsb edir.

Qarabağ ərazisində əsasən XX əsrin 70-80-ci illərində görkəmli arxeoloq İdeal Nərimanov tərəfindən geniş arxeoloji tədqiqat işləri aparılmışdır. Əslən qarabağlı olan arxeoloq onlarla abidəni qeydiyyata alaraq tədqiq etmişdir. Qarabağ ərazisində daha geniş arxeoloji kəşfiyyat işləri keçən əsrin 80-ci illərinin sonlarında arxeoloq alim Hidayət Cəfərov tərəfindən aparılmış, yüzdən çox abidə ilkin olaraq qeydiyyata alınmışdır.

Milli Azərbaycan Tarixi Muzeyində az sayda Şuşa arxeoloji materillarının olması haqqında informasiyanı Fariz Xəlillinin araşdırmalarında görürük. Onun son zamanlarda apardığıaraşdırmalar zamanı muzeydə Redkin lager materialları adı altında qeyd olunmuş tunc gəm(inv. № 1052), ox ucları (inv. № 1037; 1038), xəncər başlığı (inv.№ 1057), düymələr (inv. № 1056; 1060), lövhəcik və ya kəmər hissəsi (inv. № 1058; 1051), qolbaqlar (inv. № 1045; 1046), çaxmaqdaşı və dəvəgözüdən ox ucları (inv.№ 1039; 1040), əqiq və balıqqulağı muncuqlar (inv. № 1053; 1059; 1054; 1055), heyvan dişləri (inv. № 1048; 1050)və çürümüş ağac parçasından (inv. № 1049) ibarət maddi-mədəniyyətnümunələrinin məhz Şuşadan olduğu müəyyən edilmişdir (Xəlilli, 2017: 19).

Mədəniyyət Nazirliyi artıq regionda mədəniyyət obyektlərinin bərpası ilə yanaşı, müasir tələblərə uyğun yeni muzey və mədəniyyət ocaqlarının da yaradılacağını açıqlamışdır. Təbii ki, onların arasında Qarabağın bir sıra şəhərlərinin tarixi muzeyləri olmalı və ilk növbədə Azərbaycanın mədəniyyət, musiqi və poetik sənət mərkəzlərindən biri olan Şuşa Tarixi Muzeyi yaradılmalıdır. Təsadüfi deyil ki, bu yaxınlarda Prezident İlham Əliyev Şuşanı Azərbaycanın mədəniyyət paytaxtı elan etmişdir.

Yeddi ildən artıqdır ki, Bakı Tarixi Muzeyinin ilkin konsepsiyası işlənib hazırlansa da, hələ öz praktik həllini tapmayıb. Baxmayaraq ki, şəhər muzeyləri şəhərlə bağlı materialların sənədləşdirilməsi baxımından böyük əhəmiyyət kəsb edir. Şəhərlər unikallığı, irsin sonrakı nəsillərə ötürülməsi və turizm sektorunun inkişafı nöqteyi-nəzərindənqonaqları çox maraqlandırır.

Bütün bu məqamları nəzərə alaraq Şuşa Tarixi Muzeyinin müasir standartlara uyğun yaradılması ən mühüm prioritetə çevrilir. XXI əsrdə XIX əsrin klassik muzeyləri modelində qurumlar yaratmaq maraqlı görünmür. Azərbaycanın və bütövlükdə Şərqin özünəməxsus texnoloji nailiyyətlərə və dinamizm prinsiplərinə əsaslanan yeni strukturlarda bu öz əksini tapmalıdır. Muzeylərin fəaliyyətində multimedia texnologiyalarından istifadə həm respublikanın regionlarında, həm də ölkədən kənarda dinamik, interaktiv proqramların və sərgilərin nümayişi üçün geniş imkanlar yaradan muzeylərin yaxın zamanlarda meydana çıxmasında mühüm rol oynayacaq. Dünyada belə bir təcrübə var: birincisi, virtual muzey yaradılır, müvafiq bina görünəndən sonra isə ənənəvi muzey təşkil edilir. Hər iki halda multimedia texnologiyalarından istifadə məcburidir.

Beləliklə, şəhərin yaranmasından başlayaraq ən mühüm tarixi hadisələr Şuşa Tarixi Muzeyində öz əksini tapa bilər. Şəhərin mənşəyi haqqında müxtəlif sənədlər, xəritələr, fotoşəkillər, xarici siyasi xadimlərin və səyahətçilərin qeydləri geniş şəkildə təqdim edilə bilər. Əsas məqsədŞuşanın yaranma və inkişaf tarixini iddialardan uzaq əyani materiallar vasitəsilə muzey ziyarətçilərinə çatdırmaq olmalıdır.

Müharibədən sonra yaranmış ictimai-siyasi vəziyyəti və bir sıra dövlətlərin Azərbaycana qarşı qərəzli münasibətini nəzərə alaraq, erməni tərəfinin yaydığı stereotiplərin, saxtakarlıqların və yalanların məhv edilməsi, dünya ictimaiyyətinə və geniş kütlələrə həqiqəti əks etdirən məlumatların çatdırılması istiqamətində iş daha fəal həyata keçirilməlidir. Muzeylər bu məsələdə əvəzsiz rol oynayır və biz düşmənə bizi təkzib etmək üçün zərrə qədər şans vermədən özümüzü yalnız təsdiqlənmiş fakt və materiallarla silahlandırmalıyıq.

Muzeyin yaradılan bölmələrində Şuşanın arxeoloji və memarlıq irsi, təsviri sənətinin inkişafı, xalçaçılıq, elm, təhsil, ədəbi məclislərin fəaliyyəti, şəhərdən olan şair, yazıçı və dramaturqların yaradıcılığına dair materiallar təqdim edilə bilər. Məsələn, muzey ekspozisiyalarında şəhər məhəllələrinin salınması mərhələləri, Şuşa real məktəbinin və digər təhsil ocaqlarının tanınmış məzunlarının fəaliyyəti, görkəmli Azərbaycan şairi Molla Pənah Vaqifin siyasi-ictimai fəaliyyəti, bir sıra təşkilatçıların təşkil etdiyi məclis öz əksini tapmalıdır. mədəniyyət xadimləri, Xurşidbanu Natəvanın ictimai fəaliyyəti və onun Aleksandr Düma ilə tarixi görüşü, görkəmli maarifçi, ədəbiyyatşünas və müəllim Firudin bəy Köçərlinin fəaliyyəti və s. (Kərimov, 2002: 31).

Şuşa Tarixi Muzeyində tanınmış soydaşlarımızın dünyanın müxtəlif ölkələrinin maarif xadimləri, şairləri, bəstəkarları ilə əlaqələrinə böyük diqqət yetirilməlidir. Muzeyşünaslıqda geniş tətbiq edilən belə bir üsul, şübhəsiz ki, xarici ziyarətçilərə layiqincə təsir edəcək. Muzeyin ayrıca bölməsi "Qafqaz Konservatoriyası"nın Azərbaycan və bütün dünya musiqi sənətinin inkişaf tarixinə verdiyi töhfəyə həsr edilməlidir. Şuşada keçirilən musiqi məclisləri, xalq musiqisinin, vokal və muğam sənətinin inkişafı, respublika musiqi sənətinin görkəmli nümayəndələri, o cümlədən musiqişünaslıq elminin inkişafı (məsələn, AMEA-nın yaradıcılarından birinin bu elmi sahəyə verdiyi töhfələr), görkəmli bəstəkar, publisist və ictimai xadim Üzeyir Hacıbəyli) - bütün bu məqamlar ekspozisiyada öz əksini tapmalıdır.

Tanınmış şuşalıların musiqi mühitində xarici həmkarları, siyasi və ictimai xadimlərlə əlaqələrinə dair materiallar təqdim oluna bilər. Məsələn, Cabbar Qaryağdıoğlunun Sergey Yesenin, Fyodor Şaliapin və Reinqold Qlierlə görüşləri, dünya şöhrətli müğənni Rəşid Behbudovun, xanəndə Məcid Behbudovun fəaliyyəti.

Bölmələrdən birində foto və video materiallar, cəbhə xatirələri həmçinin Şuşa uğrunda döyüşlərdə fərqlənmiş əsgərlər və Azərbaycanın Milli Qəhrəmanları (burada Azərbaycan vətəndaşları olduğu üçün ölkəmizin etnik palitrası da qeyd olunacaq) haqqında materiallar təqdim olunabilər. Əsgərlərin xatirələri və şəxsi əşyaları, qələbəmiz və Şuşanın azad edilməsinə dair məktublar, materiallar olacaq.

Muzeyin təşkili ilə AMEA-nın Qarabağ regional elmi şöbəsinin yaradılması, Akademiyanın müvafiq elmi müəssisələri, Mədəniyyət Nazirliyi, Dövlət Turizm Agentliyi və digər strukturlar məşğul olmalı, faktiki materialların toplanması təmin edilməlidir. Dəqiq elmi yanaşmaya əsaslanaraq müxtəlif sahələrdə çalışan alimlərin fəaliyyəti mərkəzləşdirilmiş qaydada təşkil edilməlidir. Əsas diqqət elmi xarakterə, dəqiqliyə və bununla birlikdə texnologiyaların geniş tətbiqinə yönəldilməlidir.

Erməni təbliğatı istənilən bəhanə ilə Azərbaycanı Qarabağdakı mədəni irsi "məhv etməkdə" ittiham etməkdə davam edir. Belə ki, Qafqaz İrsinin Mühafizəsi (Caucasus Heritage Watch) beynəlxalq təşkilatı rəsmi səhifəsində Şuşadakı Təsviri İncəsənət Muzeyinin Heykəltəraşlıq Parkından 51 heykəlin götürüldüyünü göstərən peyk görüntülərini yerləşdirib. Burada qeyd etmək lazımdır ki, bu heykəllər həmin illərdə Ermənistanın işğalı altında olan Şuşada keçirilən beş beynəlxalq heykəltəraş simpoziumunun iştirakçıları tərəfindən qoyulmuşdur. Azərbaycanın beynəlxalq səviyyədə tanınmış ərazisində keçirilən bu tədbirlərin iştirakçıları qanunsuz olaraq Şuşaya gəliblər. Ermənistanın beynəlxalq hüquq normalarına və Qarabağ münaqişəsi ilə bağlı BMT Təhlükəsizlik Şurasının müvafiq qətnamələrinə məhəl qoymayan işğalçılıq siyasətini dəstəkləyiblər.

Ermənistanın Azərbaycana təcavüzü nəticəsində 2645 tarix-mədəniyyət, 1814 memarlıq, 747 arxeoloji abidə, 64 bağ və park abidəsi, 23 muzey, 102757 muzey eksponatı, 4 dövlət qalereyası, 376 rəsm əsəri dağıdılıb. Bundan əlavə, 365 klub, 761 kitabxana, 193 mədəniyyət evi, 310 məbəd, 72 məscid, 199 kurqan, 161 qədim qəbiristanlıq, 184 qədim yaşayış məskəni, 165 ibadət yeri və ziyarətgah, 39 türbə erməni işğalçıları tərəfindən dağıdılıb.

Ermənistan Azərbaycanın işğal olunmuş ərazilərində beynəlxalq humanitar hüququ pozan, beynəlxalq cinayət hüququna uyğun olaraq hərbi cinayət və insanlığa qarşı cinayət sayılan hərəkətlər həyata keçirib. Bundan əlavə, Ermənistan öz məqsədyönlü siyasəti və praktikası çərçivəsində azərbaycanlı əhalinin qovulduğu ərazilərdə etnik təmizləmə, torpaq və əmlakın zəbt edilməsi, toponimlərin dəyişdirilməsi ilə yanaşı, Azərbaycanın tarixi və mədəni köklərinin izlərini ayrı-seçkilik yolu ilə məhv etməyə çalışmışdır. Onlar Azərbaycanın mədəni irsinin dağıdılması, təhqir edilməsi, talan edilməsi və mənimsənilməsi ilə məşğul olmuşlar (Müseyibli, 2019: 24).

Bu cinayət əməllərinin məqsədi XIX əsrin əvvəllərindən başlayaraq ermənilərin bu torpaqlara köçürülməsi ilə bağlı təkzibolunmaz faktları gizlətmək və ermənilərin bu ərazilərdə guya minillik yaşamasına dair saxta tarixi faktlar yaratmaq niyyəti olub.Bu baxımdan Azərbaycanın işğal olunmuş ərazilərində tarix və mədəniyyət abidələrinin dağıdılması və qəsdən məhv edilməsi 1954-cü il “Silahlı münaqişələr zamanı mədəni sərvətlərin mühafizəsi haqqında” Haaqa Konvensiyası, 1992-ci il “Arxeoloji abidələrin mühafizəsi haqqında” Avropa Konvensiyası ilə tənzimlənir.

Ermənistanın təcavüzü Qarabağın tarixi-mədəniirsində ağır iz buraxmış, işğalçılar Azərbaycandan qovulduqdan sonra bu dəyərlərin yenidən qurulması və dirçəldilməsi istiqamətində xeyli işlərə başlanılmışdır. Təkcə Şuşa şəhərində işğal illərində 8 muzey dağıdılmış və talan edilmişdir. Natəvan, Bülbül, Əbdürrəhim bəy Haqverdiyevin ev-muzeyləri, rəsm qalereyaları, Şuşa və Xankəndi tarix-diyarşünaslıq muzeyləri tamamilə dağıdılmışdır. Şuşa şəhərinin Tarix Muzeyinin 5000-dən çox eksponatı, Azərbaycan Xalçası və Xalq Tətbiqi Sənəti Dövlət Muzeyinin Şuşa filialının eksponatları, görkəmli şəxsiyyətlərin xatirəsinə həsr olunmuş muzeylərdə bəstəkar Üzeyir Hacıbəyova (300-dən çox əsər), Azərbaycan vokal sənətinin banisi, böyük xanəndə Bülbülə (400-ə yaxın əşya), görkəmli musiqiçi və rəssam Mir Mövsüm Nəvvabaməxsus eksponatlar talan edilmişdir (Kərimov, 2002: 31).

Şuşanın zəngin mədəniyyətinin ən mühüm tərkib hissələrindən biri də rayonun məişəti ilə bağlı folklordur. Məişət xüsusiyyətləri, estetik zövqü - bir sözlə, qarabağlıların milli siması, özünəməxsusluğu xalq yaradıcılığı nümunələrində xüsusilə aydın şəkildə özünü göstərir. Bu gün dünyanın ən böyük muzeylərində Qarabağ sənəti timsalında Azərbaycan xalq sənətinin çoxlu gözəl nümunələrinə rast gəlmək olar. Londonun Viktoriya və Albert Muzeyinin, Parisdəki Luvr Muzeyinin zəngin kolleksiyalarında, Vyana, Roma, Berlin, İstanbul, Tehran, Qahirə kolleksiyalarında Qarabağda yaradılmış sənət əsərlərini görmək olar.

XIX əsrin sonu-XX əsrin əvvəllərindəAzərbaycanın müxtəlif yerlərində əcnəbi arxeoloqlar tərəfindən aşkar edilmiş mədəniyyət nümunələri tez-tez xaricə aparılırdı.Vəziyyət Rusiya imperiyasında qeyri-qanuni yolla əldə edilmiş mədəni sərvətlərin ixracının qadağan edilməməsi və heç bir məhdudiyyətin olmaması, incəsənət və antik dövr abidələrinin özünün mülkiyyət və ya şəxsi mülkiyyət hesab edilməməsi ilə daha da ağırlaşırdı.Bu şübhəli praktikanın qarşısını almaq üçün vətənpərvər mədəniyyət xadimlərinin şəxsi təşəbbüsü ilə yerli muzeylərin yaradılmasına cəhdlər edilib (Hüseynov, 2013: 20). Şərqdə və müsəlman dünyasında Azərbaycan Xalq Cümhuriyyətinin yaranması zamanı Azərbaycan mədəniyyətininqorunması istiqamətində xüsusi işlər görülüb. Bu baxımdan “Arxeologiya və Şərq tarixi sevərlər dərnəyi”ni qeyd etmək yerinə düşərdi. Gənc dövlət üçün çətin bir tarixi dövrdə mədəni irsin qorunması ilə məşğul olan müxtəlif təşkilatlar bir sıra obyektiv və subyektiv səbəblərdən mədəni dəyərlərin hərəkətinə nəzarət edə bilmirdilər. Bundan istifadə edən avropalı missionerlər Azərbaycan xalqının maddi-mənəvi irsinin ən yaxşı nümunələrini fəal şəkildə toplayaraq ölkədən aparıblar. Azərbaycan milli sərvətlərin dağıdılması və götürülməsinin qarşısını almaq üçün Hüseyn bəy Mirzə Camalov və Məhəmməd Ağayev Milli Məclisə müraciət ediblər. Bakıda Milli Muzeyin yaradılması xahişini nəzərə alaraq Azərbaycan Parlamenti fəaliyyətinin birinci ildönümündə İstiqlal Muzeyinin (İstiqlal Muzeyi) yaradılması haqqında qərar qəbul edib. Mövcud olduğu dörd ay ərzində muzey Azərbaycan mədəniyyətinin ən qiymətli abidələrini saxlanmağa qəbul edib (Xəlilov, 2011: 74). Azərbaycan Xalq Cümhuriyyəti süqut etdikdən sonra muzey ləğv edildi. Sovet hakimiyyətinin qurulması ilə onun eksponatları ölkəmizdə yeni muzeylərin yaradılmasında mühüm rol oynayan Azərbaycan Dövlət Muzeyinin kolleksiyasının əsasını təşkil etmişdir. Nəriman Nərimanovun 1920-ci il mayın 18-də ölkədəki bütün muzeylərin milliləşdirilməsi haqqında qərarı yeni dövlət muzeyləri şəbəkəsinin yaradılmasına səbəb oldu. 1991-ci ildə Azərbaycan Respublikası müstəqilliyini elan etdikdən sonra İstiqlal Muzeyi yenidən yaradılmışdır. Məhz burada Qarabağ muzeyləri özünə sığınacaq tapıb və öz kolleksiyalarını qoruyub saxlaya biliblər (7).

